İstənilən halda alınma sözlər zaman və məkan baxımdan məhdudur. Bura Qallo-roman dövründən alınma sözlər (*bouleau-ağcaqanad, bec-dimdik, chemin-yol*), alman dilindən alınma sözlər (*guerre-müharibə, robe-don, bleu-mavi*) daxildir. Onlar əslən alınma söz sayılmır. Zaman keçdikcə bu sözlər dildə millilik səviyyəsi qazanmışdır. Lakin IX əsrdən sonrakı dövrlərin alınma sözlərindən danışsaq, bura fransız dilində olan jarqon və ya dialektlərdən əlavə alınma jarqonlar və ya dialektlər daha çox diqqəti çəkir (Fransız dili fonetikası, 2012: 123).

Məs; *une bagne-maşın, une bahut-məktəb, un cinoche-sinema, un flic-polis, un pognon-pul, un bouquin-kitab, un dico- sözlük, un gamin-uşaq*

Alınma sözlər aşağıdakı qaydada götürülə bilər;

a) Söz: Leksik alınma sözlər öz forması, əsas və ya xüsusi məna(lar)ı, (*aquarelle-akvarel, steppe-çöl*) ilə gəlir. Söz kəsilmiş formada işlədilə və ya alınma dilində qısaldılmış halda keçə bilər;

*b)* Məna: Mənasına görə yaxınlıq və ya eyni məna bildirən sözlər *(réaliser- aydın fikrə sahib olmaq)*

c) Daxili forma: Daxil forma qorunmaqla eyni mənaya gələn ifadə kimi. Beləliklə, *voir voler des éléphants-kabus görmək,* ingilis dilindən *to see pink elephants* ifadə şəklində götürülmüşdür.

*d)* Morfolji elementlər *(-ade, -esque, -ing şəkilçiləri: parking-avtomobil dayanacağı)*

Alınma sözlərin fransız dilinə daxil olma yolları müxtəlifdir.

a) Birbaşa xarici dildən gələnlər (*soldat-əsgər*).

b) Dolayı alınma sözlər *(châle-şal, hussard-süvari*).

c) Aller-retour-yenidən qayıtmış alınma sözlər xarici dildən keçdikdən sonra geri qayıdan *(mənşə və məna dəyişikliyi ilə: humour-yumor, budget-büdcə)*

Alınma sözlər hədəf dilin normalarına müxtəlif dərəcədə uyğunlaşır.Zəif uyğunlaşmalar təzahür edənalınma sözlər var. Belə sözlər ksenizm adlanır. Bura yazılış və tələffüzünü saxlayan və ya mənaları eyniolan alınma söz birləşmələri daxildir:

Məs; *İt's in the pocket (You've got it made)-C'est dans la poche, c'est comme si c'était fait= Bu işbitmişdir.*

Assimilyasiya prosesində dilə daxil olmuş alınma sözlər orfoqrafiya və tələffüzün fransız dilində olan digər sözlərə uyğunlaşa bilər. Bu da çox zaman fonetik dubletlərin yaranmasına səbəb olur. Təbiiləşdirilmiş sözlər az-çox dərin fonetik və morfoloji dəyişiklərə məruz qalır ki, bu da onları fransız dilində olan digər sözlərlə eyniləşdirir. Bundan əlavə, onlar törəmələrin yaradılması üçün əsas kimi xidmət edirlər (Fransız-Azərbaycan dilində müasir lüğət, 2009: 1-320):

Məs; *No comment-sans commentaire, passons*
*Of course-bien entendu(bien sûr), évidementPeace*
*and love- paix et amour*

Burdan da aydın görünür ki, ksenizmlərin bir çox qismi fransız dilinə ingilis dilində təsir etməkdədir.

Alınma sözlər və təkrar alınmış sözlər çox tez-tez olur, təmasda olan dillər demək olar ki, daimi vəhər iki istiqamətdə söz və söz birləşməsi mübadiləsi aparır [wiki]:

Məs; Fransız dilində *bougette* ingilis dilində *budget* götürmüşfransız dilinə yenidən *budget* olaraq işlədilməkdədir.

Alınma sözlər şifahi və ya yazılı yolla dilə daxil olur. *Ölü dillər*hesab edilən latın, qədim yunan dillərindən keçmiş alınma sözlər ilk olaraq şifahi halda danışıqda işlədildikdəndən sonra lüğətdə yerini almış olur (French-Azerbaijan dictionary, 2018: 1-90)

Alınma sözlərin istinad və əsas qaynağına, onun etimologiyasına gəldikdə, aşağıdakı növlərə ayrmaq olar:

*a)*Fransız dilində adı çəkilən əcnəbi söz və ya anlayış; *fax-faks, football-futbol, café-kofe, concert-konsert*

*b)* Başqa xalqların həyat, mədəniyyətini səciyyələndirən sözlər; *samovar-samovar, steppe-çöl*

*c)*Fransız dilində olan mövcud olan anlayışın başqa idiomdan götürülüb və patafraza ilə ifadə edilməsi; *folklore-folklor(xalq adət-ənənələri)*

Alınma sözlər struktur-semantik növlərinə gəldikdə dörd yerə ayrılır:

1. Morfemlər ; *club-klub, opéra-opera, sucre-şəkər(qənd),*

*2.* Qismən əvəz edilmiş morfemlər; *reuscrire (italyan dilində)-réussir=uğur qazanmaq, to stop (ingilis dilində)-stopper=dayanmaq*

*3.* Yeni söz yaratmış morfemlər; *loud-speaker (ingdilis dilində)-haut-parleur=yüksək səsli dinamik*

4. Əvəz edilmiş morfemlər; *sky-scraper (ingilis dilində)-gratte-ciel=göydələn(yüksək, hündür), Kindergarten(alman dilində)-jardin d'enfants=uşaq bağçası.*

Alınma sözlərin özü də növlərə ayrılır. Bu proses dilin sadələşməsinə və asanlaşmasına kömək edir.

1. Birbaşa alınma sözlər; söz və ya sözlər birləşmələri dəyişdirilmədən, yaxud fonetik, orfoqrafya uyğunlaşması ilə alındıqda;

Məs; artéfact (ingilis mənşəli və dəyişdirilmədən (işarə nəzərə alınmadan) uyğunlaşmış söz) - insan, suni mənşəli, təbii faktların öyrənilməsinə müdaxilə edən hadisə; sənət və ya insan sanayesinin məhsulu, démotion (latın və slavyan mənşəli, orfoqrafik və fonetikaya uyğunlaşmış söz) - vəzifənin aşağı salınması, cafétéria (latın mənşəli və orfoqrafikaya (işarə nəzərə alınmadan) uyğunlaşdırılmış söz) - yeməkxana, boléro (latın mənşəli və dəyişdirilmədən (işarə nzərə alınmadan) uyğunlaşmış söz) - qısa və qolsuz qadın gödəkcəsi, cannelloni (italyan mənşəli və dəyişdirilmədən uyğunlaşmış söz) - yaxa büzməsi, kətan yaxası, sequunturque (latın mənşəli və fonetikaya uyğunlaşdırılmış söz) - ardıcıllıq deməkdir.

2. Söz və ya söz birləşmələri az-çox sadə dilə uyğunlaşdırıb tərcümə edildikdə;
Məs; Qonaq otağı; salle de séjour-living-room, bal ayı; lune de miel-honeymoon

3. Semantik alınma sözlər; hədəf dildə sözə yad mənşəli məna əlavə edildikdə;

Məs; İngilis dilində olan to realize feili fransız dilinə réaliser-həyata keçirmək olaraq uyğunlaşmış, həmçinin ingilis dilində to have the blues frazoloji birləşməsi fransız dilinə avoir les bleus-ürkək olmaq kimi uyğunlaşmış, eyni ilə də ingilis dilində olan it´s not my cup of tea ifadə fransız dilinə ce n´est pas ma tasse de thé-bu mənə uyğun deyil ifadəsikimi çevrilir (Gaston Zing The Old Frenchman, 1992: 10-300).

Əsas nitq hissəsi olan isim, sifət, feillərdə alınma sözlər daha çox müşahidə edilir. Bunun başlıca səbəbi həmin sözlərin söz ehtiyatı genişləndirilə bilən, leksik siniflərə aid olmasıdır. Digər nitq hissələri (zərf, əvəzlik, bağlayıcı və.s) genişlənməkdə daha az olan leksik siniflər hesab edilir.

Fransız dilində klassik *(agriculture-kənd təsərrüfatı, avarice-xəsislik, assimiler-uyğunlaşdırmaq, autorité-səlahiyyət, charité-xeyriyyə, concours-rəqabət, criminel-cinayətkar, évolution-təkamül, explication-izahat)*, şərq *(amen-amin, satan-şeytan, caravane-karavan, dervich-dərviş)*, roman *(art-incəsənət, balcone-eyvan, cabinetto-kabinet, iş otağı, opera-opera)*, və rus *(comsomol-komsomol, mazout-yanacaq, rouble-(pul vahidi)rubl)* dillərindən alınma sözlər var (Jean-Francois Halte French didactics, 1992: 80-100).

Sözlərin bir dildən digərinə asanlıqla keçməsi pereqrinizim adlanır. Bura qəbul edilmiş konkret sözlər daxildir; *coton-pambıq, chocolat-şokolat, sucre-şəkər, café-qəhvə.etc*

Bundan əlavə fransa ərazisində yaşayan milli azlıqların fransız dili lüğətinə verdiyi töhfə daha az nəzərə çarpır. Breton (*goéland (goéland)-qağayı, bijou(bijou)-ləl-cəvahirat, biniou(biniou)-tuluq*), Bask(*aide(aider)-yardım, hau(haut)r-hündürlük, olio(olive)-zeytun yağ*) xalqların dili daxildir.

Fransız dilində əksər alınma sözlər latın dilindən götürülmüşdür. Bu da tarixin gedişatından yaranmışdır. Məlumdur ki, fransız dili işğaldan sonra Qalliya ərazisində danışılan latın dilindən götürülüb. Ancaq bu sözlər zaman keçdikcə, yavaş-yavaş müəyyən dəyişikliklərlə indi də fransız dilində istifadə olunur (Paul, 2012: 120-128).

Leksik fond fransız dili lüğətinə XII əsrin sonunda bütün regionlar və dil nümunələrini birləşdirmiş və hazırda "*Le Petit Robert*" lüğətinin təklif etdiyi sözlərin üçdə biri yəni 95%i latın dilindən götürülmüşdür. *Acif-activus, anémie-anaemia, capituler-capitulare, épidémie-epidemia, hôpital-hospitalis, âcre-acrem, légal-legalis, capitale-capitalem, naviguer-navigare* sözlərini buna misal göstərmək olar (Pyotr, 58-62).

Bu təqdiqatların astanasında olan sözlərə baxsaq, "Agenda" latın dilində "*hərəkət etmək yaxud gündəm*" mənasını verən "agere" feilindən törənmiş gündəlik fəaliyyətə aid sözdür.

"Et caetera" latın ifadəsi olub fransızcaya keçmiş hərifi mənada "və sair" deməkdir. Yaxud "idem" latın mənşəyli söz fransızcadan dilimizə "eyni, eynən" mənasında işlədilən sözdür.

Bəzi alınma sözlər də var ki, həmin söz yaradan şəxsin adı ilə dilə daxil edilir. "Avocat" vəkil (ədalət köməkçisi) sözü kök olaraq onu yaradan şəxsin adından götürülmüşdür (10).

Mədəni, iqtisadi yaxud siyasi baxımdan dominant ölkələrin dili çox vaxt söz donoruna çevrilir; Buna hərbi, biznes, təhsil, tibb danışıqda işlədilən və ekvivalent sözlər daxil edilir. Lüğət anlayışı məlum olduğundan buna aid edilən ekvivalentindən danışılsa, burada alınma söz bəzən həddən artıq ümumiləşdirilmiş, götürülmüş olan yalnız sinonim və ya əvvəlcədən mövcud olan qarşılığa daha az uyğun gəlir.

Bu zaman buna qarşılıq ekvivalent söz işlədilir (11). "Publish" feili ingilis dilində "göndərmək" anlayışı olduğu halda fransız dilində eyni məna daşımır. Bu zaman poster (envoyer) feili fransızcaya ekvivalent olaraq keçmiş olur.Buradan alınma sözlərin digər bölməsi olan *etimoloji dubletlər* yaranmış olur.

Dildə etimoloji və fonetik dubletlər mövcuddur.Etimoloji dubletlər eyni sözün fərqli mənaları olan ikiqat törəmələrdir və təkamülün müxtəlif dövrlərində fransız dili lüğətində öz yerini almışdır. Burada alınma sözlərlə qarşılığı olan yaxud alınma sözün özünün dilə uyğunlaşmış formasını misal göstərməkolar (12):

- *Qulaq asmaq;ausculter(latın dilində), ausculter(roman dilində)-écouter(fransız dilində)*
- *Hamam; balneum(latın dilind), bagne(italyan dilində)-bain(fransız dilində)*
- *İfadə; expressum(latın dilində), ekspress(ingilis dilində), exprès(fransız dilində)[Fr-Az lüğət].*

Digər dillərdən alınma sözlər bir neçə vahidlə məhdudlaşır; yunan və ya latın dilindən alınma sözlər, məsələn; besant (*Biznes pul vahidi*), chalant (*gəmi*), chiere (*üz),* estore (*donanma*); ərəb dilinə bəzi hallarda hətta səlib yürüşlərindən əvvəl belə; amirant (*sultan*), amirrail (*amir*), amiré, eschec (*şahmat oyunu*), meschin-e (*gənc, qız*) kimi sözlər də bu qəbilədəndir. Bu tip sözlər alınma sözlər vaxt keçdikcə, istifadədə köhnəlir və sıradan çıxaraq köhnəlmiş sözə çevrilir. Bu zamansa, alınma sözlər yox, köhnəlmiş sözlər adlanır (13).

Tələffüzə gəldikdə isə, alınma sözlərin böyük əksəriyyəti fransız dilinin vurğu və səs sisteminə uyğunlaşır. Fransız aksentinə uyğunlaşma aşağıakı kimidir:

- Əcnəbi söz oksiton (hədəf dilə keçmiş alınma sözün bütün hecalarının bu dildə bənzər səslənməsi) olduqda onun hecalarından heç biri silinmir; *caparaçon – caparazon, bouledogue – bull-dog, redingote – riding-coat.*
- Əcnəbi söz paroksiton (hədəf dilə keçmiş alınma sözün bu dildə ilk hecalarının bənzər səsləndirilməsi) olduqda vurğu çox vaxt eyni hecada saxlanılır, belə ki bu məqsədlə bəzən sonuncu heca çıxarılır; *artisan – artigiano, balcon – balcone, chocolat – chocolate.*

Hər bir dilin lüğətində bir neçə başqa dil üçün ümumi olan bir sıra sözlər var. Bu sözlər qarşılıqlı mübadilə nəticəsində lüğətdə meydana çıxır və beynəlxalq linqvistik bazanı təşkil edir. Alınma sözlər beynəlxalq linqvistik bazanı formalaşması üçün prioritet rol oynayır və ilk növbədə xüsusi terminologiyanı (elm, sənət, tibb terminləri və s.) zənginləşdirir. Hər bir dil beynəlxalq fonda öz töhfəsini verir; beləliklə, fransız dili bir sıra siyasi *(bourgeois-burjua, nationaliser-milliləşdirmək, patriote-vətənpərvər)*, incəsənət *(pianiste-pionaçu, scène-səhnə, parterre-yerdə, comédie-komediya),* texniki və elmi *(accélérateur-sürətləndirici, calculateur-kalkulyator, accumlateur-akkumlaytor)* alınma sözlərlə öz töhfəsini verdiyini misal göstərmək olar (14).

## Nəticə

Bu istinadlardan belə qənaətə gəlmək olar ki, istər fransız dili, istərsə də ana dilimiz əsirlər boyu digər dillərdən alınma sözlər hesabına öz leksifonunda zənginlik yaratmış olur. Alınma sözlər bir neçə dilə daxil olaraq ümumişləklik qazanır və belə sözlər beynəlxalq linvistik bazanı təşkil edir. Qarşılıqlı mübadilə nəticəsində lüğətdə meydana çıxan alınma sözlər beynəlxalq linvistik fondun formalaşması üçün əsas rol oynayır və ilk növbədə terminologiyanı zənginləşdirir. Beləliklə hər bir dil beynəlxalq fonda öz töhvəsini alınma sözlərlə verir. Qloballaşan, elm və texnikanın sürətlə inkişaf etdiyi müasir dövrümüzdə beynəlmiləlçilik hər bir dilin lüğət tərkibinə çox sayda ümumi, ortaq sözlər bəxş edir (15).

Hər il fransız dilinə 2000 alınma söz daxil olmaqdadır və cəmiyyətin inkişafı ilə vəhdət təşkil edəndilə daxil olmuş sözlərin daima tədqiqatına ehtiyac duyulduğunu görürük. Məqalədə də qısa şəkildə bəhs olunmuş alınma sözlər haqqında daha geniş parallellər aparmaq olar. Bu da alınma sözlərin mənşəyini, tarixini öyrənmək baxımından əhəmiyyətli olub, yeni araşdırmaların yaranmasını tələb edir (16).

**Ədəbiyyat**

1. Azərbaycan-Fransa. (2008). M.F.Axundov ad. Milli Kitabxana, s.33-80.
2. Claude Hagege French linguist. (1995-1998). Paris, s.20-43.
3. Fransız dili fonetikası. (2012). Bakı. 123 s.
4. Fransız-Azərbaycan dilində müasir lüğət. (2009), s.1-320.
5. French-Azerbaijan dictionary. (2018). s.1-90.
6. Gaston Zing The Old Frenchman. (1992). Paris, s.10-300.
7. Jean-Francois Halte French didactics. (1992). s.80-100.
8. Paul, M. (2012). Etimologiya, Roma, VCB: s.120-128.
9. Pyotr, L. Leksikanın zənginləşdirilməsi. Moskva, Krasny: s.58-62.
10. https://www.ethnologue.com/language/fra
11. http://www.lerobert.com/dictionnaires/français/etymologie
12. https://www.un.org/en/our/-work/official-languages
13. https://www.academie-francaise.fr/linstitution/lhistoire
14. https://www.academie-francaise.fr/les-immortels/les-quarante-aujourdhui
15. https://id.loc.gov/vocabulary/iso639-1/fr.html
16. Wikipedia; Fransa tarixi.

Göndərilib: 26.01.2022 Qəbul edilib: 10.04.2022

DOI: https://doi.org/10.36719/2706-6185/10/20-23

**Lamiyə Adil qızı İbrahimova**
ADPU nəzdində Pedaqoji Kollec
lamiyaibragimova01@gmail.com

# KİÇİK YAŞLI UŞAQLARIN NİTQ İNKİŞAFI MƏSƏLƏSİNƏ DAİR

**Xülasə**

İnsan ünsiyyətinin ən mühüm vasitəsi olan dil, reallığı kəşf etmək, insanı mənəvi-mədəni dəyərlərini tanıtmaq üçün əsas vasitə, eləcə də təhsil və təlim üçün zəruri şərt rolunu oynayır. Böyüklər uşağın nitqini inkişaf etdirərək eyni zamanda onun intellektinin inkişafına da töhfə verirlər. Uşağın ilkin yaş mərhələsində inkişafının əsas hadisəsi nitqin mənimsənilməsidir. Uşağın nitqinin müasir inkişafı üçün bir boyuyün ona diqqət göstərməsi vacibdir. Diqqətli, qoruyucu, xeyirxah münasibət qarşılıqlı müsbət emosiyaların və müxtəlif reaksiyaların inkişafını təmin edir. Təhsil təsirləri daim aparılmalı və uşaqların psixoloji inkişafının bütün aspektlərinə yönəldilməlidir. Yalnız hərtərəfli inkişafla onların nitqi vaxtında formalaşacaq.

***Açar sözlər:*** *nitq, nitq inkişafı, kiçik yaşlı uşaqlar, ilkin yaş mərhələsi*

**Lamiya Adil Ibrahimova**
Pedagogical College under ASPU
lamiyaibragimova01@gmail.com

## On the development of speech issues of kids

**Abstract**

Language, the most important means of human communication, is a key tool for discovering reality, promoting human spiritual and cultural values, as well as plays a necessary condition role for education and training. Adults also contribute to the development of a child's intellect by developing his speech. The main event of a child's development at an early age is the acquisition of speech. It is important to pay attention to a child by an adult for the modern development of a child's speech.A careful, protective, kind attitude ensures the development of positive emotions and various reactions. Educational influences should always be carried out and focused on all aspects of children's psychological development. Only with comprehensive development will their speech be formed in time.

***Keywords:*** *speech, speech development, kids,an early age period*

## Giriş

Ənənəvi olaraq dil və nitq psixologiya, fəlsəfə və pedaqogikada psixi inkişafın müxtəlif istiqamətlərinin uzlaşdığı bir düyün kimi nəzərdən keçirilir: təfəkkür, təxəyyül, yaddaş, emosiya. İnsan ünsiyyətinin ən mühüm vasitəsi olan dil, reallığı kəşf etmək, insanı mənəvi-mədəni dəyərlərini tanıtmaq üçün əsas vasitə, eləcə də təhsil və təlim üçün zəruri şərt rolunu oynayır.

"Nitqin yaranması uşağın bütün zehni proseslərini yenidən qurur və onun inkişafı üçün yeni, qeyri-adi və vacib prespektivlər açır. Lakin nitqin mənimsənilməsi dərhal baş vermir, bir sıra mərhələlərdən keçir" (Safina, 2016: 35-37). Məktəbəqədər dövrdə şifahi monoloq nitqin inkişafı, uğurlu məktəb təhsilinin əsasını qoyur.

Böyüklər uşağın nitqini inkişaf etdirərək eyni zamanda onun intellektinin inkişafına da töhfə verirlər. Uşağın ilkin yaş mərhələsindəinkişafının əsas hadisəsi nitqin mənimsənilməsidir. Nitqin yaranması uşağın bütün zehni proseslərini yenidən qurur və onun inkişafı üçün yeni, qeyri-adi,vacib perspektivlər yaradır.Lakin nitqin mənimsənilməsi dərhal baş vermir, bir sıra mərhələlərdən keçir. Uşağın həyatının ilk ilində nitq olmur.Onu digər qeyri-verbal ünsiyyət vasitələri – emosianal ifadələr, üz ifadələri, daha sonra jestlər, duruşlar, hərəkətlər, səslər əvəz edir.

"Dil öz quruluşuna görə bəşəriyyətin ən mürəkkəb ixtiralarından olmasına baxmayaraq,bütün ölkələrin və xalqların uşaqlarıonu erkən yaşlarından təəccüblü şəkildə asanlıqla mənimsəyərək

nitqə yiyələnirlər və bu proses bütün uşaqlarda başlayır, eyni şəkildə və eyni mərhələlərdən keçir” (Psixologiya: Uçeb, 2003).

Təxminən bir yaşa qədər uşaq ayrı-ayrı sözləri tələffüz edir; iki yaşında iki və ya üç sözdən ibarət cümlələrlə danışır; dörd yaşına qədər uşaqlar böyüklər kimi demək olar ki, yaxşı danışa bilirlər.

Uşaqlar ilk öncə bir çox keyfiyyətləri özündə birləşdirən sözü bir anlayış kimi tam deyil, yalnız sözün ilkin olaraq onların qavrayışlarında əlaqəli olduğu obyektə xas olan fərdi xüsusiyyətlərini öyrənirlər.Gələcəkdə təxminən 1 yaş yarım ilə 2 yaş yarıma qədər bu sözdən istifadə təcrübəsi toplandıqca uşaqlar tədricən anlayışın daha dərin,ümumiləşdirilmiş mənasına yiyələnirlər.Bu zaman uşaqlar sözləri birləşdirməyi, onları iki və ya üç sözlü kiçik ifadələrə çevirməyi və belə ifadələrdən tam cümlələr qurmağa qədər olduqca böyük yol qət edirlər.

Uşağın həyatının ikinci ilinin ikinci yarısı ətrafdakı insanların davranışlarını idarə etməyə və öz davranışını mənimsəməyə yönəlmiş aktiv müstəqil nitqə keçid ilə xarakterizə olunur. Körpənin 11-ci ayından etibarən prefonemik nitqdən fonemik nitqə keçid də başlayır və bu proses həyatının ikinci, üçüncü, hətta dördüncü ilində də davam edir. Psixoloq, müəllim və dilçi alimlərin araşdırmaları onu deməyə əsas verir ki, erkən yaşlarında dilin səs istiqaməti uşağın diqqət obyektinə çevrilir (Uşakova, Strunina, 2004). yaşına qədər uşaq, bütün sözlərin qrammatik uyğunluğunu təminedən ətraflı cümlələr qurur.

Nitqin qrammatik strukturunun tədricən inkişafı nəticəsində üç yaşına qədər uşaq demək olar ki, sifət və əvəzliyin köməyi ilə mürəkkəb cümlələr qura bilir. Təxminən eyni zamanda, uşağın öz nitq ifadəsinin və başqa bir insanın nitqinin düzgünlüyünə şüurlu nəzarət yaranır.

Həyatının ikinci ilində uşağın ətrafdakı dünyaya marağı kəskin şəkildə artır. Uşaq hər şeyi bilmək, toxunmaq, görmək, eşitmək istəyir. Xüsusilə cisim və hadisələrin adları ilə maraqlanır və hərdən böyüklərə belə bir sual verir: “Bu nədir?” Cavab aldıqdan sonra uşaq hər zaman eşitdikləri ilə kifayətlənmir; o, şübhəsiz ki, adı xatırlamaq istəyir və onu özbaşına təkrarlayır və bir qayda olaraq, çox çətinlik çəkmədən dərhal sözləri əzbərləyir.

Bir il yarımdan sonra uşaq şifahi ünsiyyətdə öz fəaliyyətini göstərməyə başlayır və ətrafındakı obyektlərin adlarını soruşur.Əvvəlcə o, bu cür suallar vermək üçün mimika, jest və pantomima dilindən istifadə edir, çox vaxt sadəcə onu maraqlandıran şeyi əli və ya barmağı ilə böyüklərəgöstərir və onlardan müvafiq obyekt və ya hadisənin adını çəkməsini gözləyir. Sonra uşağın bir sözlə ifadə olunan sualı jestinə əlavə olunur.

Maraqlıdır ki, əvvəllər bir obyektin adını artıq eşitmiş bir uşaq bəzən ona aid müvafiq sualla dəfələrlə böyüklərə müraciət edir. Əgər valideyn uşağa artıq tanış olan bir obyekti səhv adlandırırsa, uşaq belə bir cavabla kifayətlənmir və düzgün cavab alana qədər sualını təkrarlayır. Belə suallarla azyaşlı uşaq sanki öz biliyini yoxlayır və onu maraqlandıran adları xatırlayır.

Yeni obyektlərlə tanış olan uşaqlar, ilk növbədə, böyüklərə sual verərək, öz funksiyalarını müəyyənləşdirməyə çalışırlar: "Bu nə adlanır?". Belə bir suala cavab olaraq, böyüklər adətən nəinki obyektin adını çəkir, həm də uşağa ondan necə düzgün istifadə edəcəyini göstərir.

Uşaqların nitqində semantik funksiyanın inkişafı sözlərin mənasının müəyyən edilməsi, onların fərqləndirilməsi, aydınlaşdırılması və dildə onlarla əlaqəli ümumiləşdirilmiş mənaların sözlərlə mənimsənilməsidir.

Nitqin inkişafında xüsusi bir xətt, nitqin ünsiyyət vasitəsi kimi istifadəsi, digər insanların davranışlarına nəzarət və özünü tənzimləmə ilə əlaqəlidir.Təxminən 2 yaş yarım ilə 3 yaş arasında olan bir uşaq, xüsusən də bir neçə alternativ hərəkətdən birini seçmək tələbini ehtiva edən bir böyüyün mürəkkəb şifahi göstərişini hələ yerinə yetirə bilmir. Yalnız 3yaş yarım, bəzən isə 4 yaşa qədər uşaqlarda şifahi göstərişlərin təsiri altında kompleks seçim reaksiyası yaranır.

Üç yaşlı uşağın nitqi əsasən sadə cümlələrdən ibarətdir. Bu yaşdan başlayaraq, gələcəkdə yaşayacağımız xüsusiyyətləri, funksiyaları və həyatında eqosentrik nitqin ilk əlamətləri görünür.

Nitq istehsalında şərtli refleks təzahürü funksiyası böyüklərin müxtəlif mükafatlardan istifadə etməsi uşaqların nitqinin inkişafınısürətləndirir. Lakin bunsuz uşaqda nitqin ümumiyyətlə formalaşmayacağını söyləmək olmaz.

Məlumdur ki, bəzi valideynlər uşağın nitqi mənimsəməsinin ilkin dövründə uzun müddət uşaq üçün əhəmiyyətli olan mükafatlandırma sistemindən bilərəkdən istifadə etmirlər. Bu, ananın və uşağı əhatə edən digər böyüklərin ümumiyyətlə uşaqlarla ünsiyyətə az vaxt ayırdığı nadir ailələrdə, həmçinin uşaqların bu cür diqqətdən çox məhrum olduğu, məsələn, uşaq evlərində xüsusilə nəzərə çarpır. Buna baxmayaraq, bu şərtlərdə də uşağın nitqi tələb olunan vaxta qədər inkişaf edir.

"Uşaq dili" böyüklərdən birincisi, sözlərin səsi ilə, ikincisi, mənası ilə fərqlənir. Uşağın ilk sözlərinin səs tərkibi böyüklərin sözlərin səs tərkibindən kəskin şəkildə fərqlənir. Uşaq dediyi sözlərin başqa bir xüsusiyyəti onların mənasının orijinallılığıdır.

Uşaqların nitqindəki sözlərin heç biri dilimizə düzgün tərcümə oluna bilməz, çünki uşaqlar obyektləri tamam başqa cür görür və təyin edirlər. Məsələn, uşaq "kıx" sözü ilə müxtəlif əşyaları çağıra bilər - pişik, kürk, ana saçı, yorğan - bir sözlə, hər şey yumşaq və tüklüdür. Hər bir uşağın inkişafında avtonom uşaqların nitq dövrü var. Bu dövrdə uşağın nitqinin olub-olmadığını söyləmək mümkün deyil, çünki o, sözün "böyük" mənasında nitqi yoxdur və eyni zamanda artıq danışır.

Nitqin inkişafı iki əsas istiqamətə malikdir: sözün passiv (nitqin başa düşülməsi) və aktiv (danışıq) qavranılması. Adətən passiv nitq aktiv nitqdən əvvəl olur. Müəyyən bir vaxta qədər başa düşülən sözlərin sayı aktiv şəkildə danışılanların sayını xeyli üstələyir. Bəzi uşaqlar üçün isə bu müddət çox uzundur. Uşaq iki yaşına qədər böyüklərin ona söylədiyi hər şeyi yaxşı başa düşə bilər, lakin heç bir söz deməz və ya ümumiyyətlə susar, ya da çıxardığı bəzi səslərin köməyi ilə özünü izah etməyə çalışar.

Uşaq niyə danışmağa başlayır? Söz hər şeydən əvvəl işarədir, yəni başqa obyektin əvəzedicisidir. Bu o deməkdir ki, hər sözün arxasında hansısa obyekt olmalıdır: onun ifadə etdiyi ənənələr, yeniliklər, yəni sözün mənası. Əgər belə bir obyekt yoxdursa,bir il yarıma qədər ana və uşaq qarşılıqlı sevginin təzahürləri ilə məhdudlaşırsa, ananın uşaqla nə qədər danışmasından və sözləri təkrarlamasından asılı olmayaraq, ilk sözlər deyilmiyə bilər.

Ana uşaqla oyun oynayırsa, onun hərəkətləri və eyni oyuncaqlar onların ünsiyyətinin mövzusu (və ya məzmunu) olur. Lakin uşaq həvəslə əşyalarla oynayır, əgər bunu tək başına etməyə üstünlük verirsə, uşağın aktiv sözləri də gecikir: onun obyektin adını çəkməyə, xahişlə kiməsə müraciət etməyə, təəssüratlarını ifadə etməyə ehtiyac yoxdur.

Danışmaq ehtiyacı və vacibliyi iki əsas özündə şərti ehtiva edir: 1) böyüklərlə ünsiyyət ehtiyacı;

2) obyektin adlandırılmasına ehtiyac. Hər ikisi fərdi olaraq hələ söz deyil. Əsas məsələ təkcə danışmaq deyil, uşaqla oynamaq və birgə oyunla bağlı uşaqla söhbət etməkdir. Kublar, piramidalar, toplar, avtomobillər, şəkillər və birlikdə işləyə biləcəyiniz bir çox başqa əşyalar bunun üçün uyğundur. Körpələrin təliminin ilk addımı, onun danışmasıdır. Bu proses birbaşa uşaqların beyin inkişafı ilə əlaqəlidir. Valideynlər bu müddətin həyəcanı və sevinci ilə yanaşı övladlarının inkişafını düzgün dəyərləndirə bilərlər (Pedaqogika: tradiçii i inovaçii: materialı VII Mejdunar, 2016: 136).

İlk başda körpənin obyekti bir sözlə adlandırmağa ehtiyacı yoxdur. Belə bir ehtiyac yaranmalıdır və bunu yalnız böyüklər edə bilər. Məhz buna görə də bu yaşda uşaqlarla mütləq söhbət etmək, gündəlik hərəkətləri müzakirə etmək və kiçik uşaq şerləri oxumaq lazımdır.

Sözün mənimsənilməsi prosesində üç əsas mərhələni ayırd etmək olar ki, onların hər birinin uşaqüçün öz semantik mərkəzi var. Birinci mərhələdə situasiyanın mərkəzi obyektdir. Uşaq mimik və intonasiya-ekspressiv hərəkətlərlə müşayiət edərək ona yönəlir. İkinci mərhələdə böyüklər situasiyanın mərkəzinə çevrilir. Ona müraciət edərək uşaq müxtəlif nitq və danışmavasitələrini sınayır. Obyekti almağa çalışmaq əvəzinə işarə, jestlər, boş kəlmələr (ver-ver-ver) və digər təsir üsulları meydana çıxır. Bu cür davranış böyükləri neytrallıq vəziyyətindən çıxarmaq və diqqətini onun cəhdlərinə yönəltmək məqsədi daşıyır.Ancaq böyüklər "təslim olmur" və düzgün sözü gözləsə, uşaq nəhayət onu tələffüz etməyə çalışır. Üçüncü mərhələdə söz situasiyanın mərkəzinə çevrildi. Uşaq yalnız böyüklərə baxmağa deyil, dodaqlarına diqqət yetirir, artikulyasiyaya diqqətlə baxır (5). "Danışan", hərəkət edən dodaqların yaxından araşdırılması, uşağın nəinki eşitdiyini, həm də düzgün sözü gördüyünü aydın şəkildə göstərir. Buna görə də, kiçik uşaqlarla danışarkən hər bir səsi aydın şəkildə ifadə etmək vacibdir ki, bu səsin necə yarandığı aydın olsun.Bundan sonra sözü tələffüz etmək üçün ilk cəhdlər adətən görünür. Böyüklərlə ünsiyyət qurmadan və onlarla birlikdə oynamaq üçün kifayət qədər ehtiyac olmadıqda ilk sözlər tələffüz oluna bilməz. Uşaqlar yalnız sözü onun diqqətinin obyektinə çevirən bir böyüyün davamlı təsirləri altında sözləri aktiv şəkildə tələffüz etməyə başlayırlar. Buna görə də, bu yaşda körpə ilə daha çox danışmaq, gündəlik işləri müzakirə etmək, kitablar və uşaq mahnılarını oxumaq çox vacibdir.

Uşağın ilk aktiv sözləri həyatın ikinci ilinin ikinci yarısında yaranmağa başlayır. Bu yaşda "nitq partlayışı" baş verir ki, bu da söz ehtiyatının kəskin artması və uşağın nitqə marağının artması ilə özünü göstərir. Həyatın üçüncü ili uşağın nitq fəaliyyətinin kəskin artması ilə xarakterizə olunur. Uşaqlar artıq onlara ünvanlanan nitqi dinləyib başa düşməklə yanaşı, onlara ünvanlanmayan sözləri

də dinləyə bilirlər. Onlar artıq sadə nağılların, şeirlərin məzmununu başa düşür və böyüklərin ifasında onları dinləməyi sevirlər. Onlar kiçik şerləri və nağılları asanlıqla əzbərləyir və böyük dəqiqliklə təkrarlayırlar. Onlar artıq böyüklərə öz təəssüratları və yaxınlıqda olmayan obyektlər haqqında danışmağa çalışırlar (Borodiç, 1981: 37).

Tərbiyəçinin düzgün rəhbərliyi ilə uşaqların məişət fəaliyyəti də nitqin inkişafının əsas vasitələrindəndir. Bu üsulun üstünlüyü – bir çox uşaqların ünsiyyətə daha asan girdiyi mühitin təbiiliyində, real münasibətlərlə nitqin məzmununun birləşməsi, müəllimin uşaqlarla danışmaq üçün kifayət qədər vaxtının olmasındadır. Məişət işləri (yemək, geyinmə, tualet, gimnastika, gəzinti, yatmağa hazırlaşma) zamanı uşaqların lügət ehtiyatı hədsiz dərəcədə zənginləşir, nitq bacarıqları formalaşır, müəllim də bu zaman bədii əsərlərdən, folklor nümunələrindən geniş istifadə edir (7).

Yuxarıdakıları ümumiləşdirək demək olar ki, uşaqların nitqinin inkişafında aparıcı rol böyüklərə aiddir: ailədə valideynlər və qohumlar, uşaq bağçasında müəllim.Məktəbəqədər uşağın dili mənimsəməkdə uğuruəsasən böyüklərin nitq mədəniyyətindən, uşaqla necə danışdıqlarından, onunla şifahi ünsiyyətə nə qədər diqqət yetirdiklərindən, asılıdır.Böyüklərin nitqi həm səs(səslərin və sözlərin tələffüzü, diksiya, temp və s.), həm də lüğətin zənginliyi, dəqiqliyi baxımından ədəbi dilin, ədəbi danışıq nitqinin normalarına sözün işlənməsinin, qrammatik düzgünlüyü, ardıcıllığına uyğun gəlir. Nitqin səs hissəsi (fonetikaya) xüsusi diqqət yetirilməlidir, çünki onun çatışmazlıqlarını, məsələn, sözün istifadəsindəki çatışmazlıqlardan daha pis şəkildə danışanın özü aradan qaldırır (8).

Həmçinin, uşağın nitqinin müasir inkişafı üçün bir boyuyün ona diqqət göstərməsi vacibdir. Diqqətli, qoruyucu, xeyirxah münasibət qarşılıqlı müsbət emosiyaların və müxtəlif reaksiyaların inkişafını təmin edir. Bu keyfiyyətlər olmadan uşaqla sıx əlaqə qurmaq, onun nitqini inkişaf etdirmək mümkün deyil. Təhsil təsirləri daim aparılmalı və uşaqların psixoloji inkişafının bütün aspektlərinə yönəldilməlidir. Yalnız hərtərəfli inkişafla onların nitqi vaxtında formalaşacaq.

## Ədəbiyyat

1. Safina, L. (2016). Razvitiye redji rannevo vozrasta. Tekst: neposredstvenniy.Pedaqogik: tradiçii i innovasiya: materiali VII Mejdunarod. Nauc. Konf. (q. Celyabinsk, yanvar). Celyabinsk: Dva komsomolca, s. 35-37. URL: https://moluch.ru/conf/ped/archive/186/9321/
2. Psixologiya: Uceb. (2003). Dlya stud. Viss. ped. uceb. Zavedeniy: V 3 kn. 4-e izd. Qumanit. izd. sentr Vlados, Kn.1: Obşiye osnovı psixologi.
3. Uşakova, O., Strunina, E. (2004). Metodika razvitiya reçi detey doşkolnovo vozrasta obrazovatelnix uşerejdeniy. Qumanit. izd. sentr Vlados.
4. Pedagogika: tradiçii i inovaçii: materiali VII Mejdunar. (2016). Nauc. konf. (g. Çelyabinks, yanvar). Çelyabinsk: Dva kamsamolça, 136 s. Razvitiye reçi detey rannevo vozrasta Safina Lyubov Aleksandrovna, vospitatel QBOU Şkola №1376 (Moskva)].
5. https://saglamolun.az/index.php/usagin-saglamligi/24872-1-yasli-usaqlarda-nitq- inkisafi.html
6. Borodic, A. (1981). Metodika razvitiya reçi u detey. Prosveşeniye. Doşkolnaya pedaqogika 37.
7. https://kayzen.az/blog/KamileKazimova/24524/m%C9%99kt%C9%99b%C9%99q%C9%99d%C9%99r-ya%C5%9Fl%C4%B1lar%C4%B1n-psixoloji-x%C3%BCsusiyy%C9%99tl%C9%99ri.html
8. https://oratio.az/news/nitq-inkishafi

Göndərilib: 07.02.2022 Qəbul edilib: 13.04.2022

QƏDİM DİYAR Beynəlxalq onlayn elmi jurnal. İmpakt Faktor: 0.652. 2022 / Cild: 4 Sayı: 4 ISSN: 2706-6185
ANCIENT LAND International online scientific journal. Impact Factor: 0.652. 2022 / Volume: 4 Issue: 4 e-ISSN: 2709-4197

DOI: https://doi.org/10.36719/2706-6185/10/24-27

**Çinarə Zabit qızı İsgəndərli**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
magistrant
cinara.isgandarlli@mail.ru

# EPİK ƏSƏRLƏRİN İDEYA-MƏZMUN XÜSUSİYYƏTLƏRİNİN ÖYRƏNİLMƏSİ YOLLARI

**Xülasə**

Ədəbiyyatın tədrisində fəal təlim texnologiyaları əlverişli təlim vasitəsi olaraq həqiqətən özünü doğruldur, yürüdülən müasir təhsil siyasətinin müəyyən etdiyi tələblərə cavab verir. Təlim prosesində fəal interaktiv təlim metodlarından istifadə müəllimin vəzifəsinin kökündən dəyişməsinə və daha mühüm əhəmiyyət kəsb etməsinə səbəb olur. Müəllim bilikləri hazır şəkildə çatdıran deyil, araşdırma, təhlil və müzakirələrdə şagirdlərlə tərəf müqabillik edən tərəfə çevrilir. O, şagirdlərlə əməkdaşlıq edir və onların lazım olan məlumatları müstəqil əldə etmələrinə nail olur. VIII sinif ədəbiyyat dərsliyinə epik və lirik əsərlər daxil edilib. Şagirdlərin yaş və anlama səviyyələri nəzərə alınaraq dramatik əsərlər proqramda öz əksini tapmayıb. Dərslikdə epik janrda yazılan əsərlər üstünlük təşkil edir.

***Açar sözlər***: *epik, müqayisə, təhlil, metod, ədəbiyyat*

**Chinara Zabit Isgandarli**
Azerbaijan State Pedagogical University
master student
cinara.isgandarlli@mail.ru

## Ways of studying the idea-content propertıes of epicworks

**Abstract**

Active learning technologies in the teaching of literature really prove themselves as a convenient learning tool, meeting the requirements set bythe modern educational policy. Theuse of active / interactive teaching methods in the learning process causes thet eacher's role to change radically and become more important. The teacher is not the one who conveys knowledge in a ready-made way, but the one who interacts with students in research, analysis and discussion. He collaborates with students and makes them access the information they need independently. Epic and lyrical works are included in the 8th grad eliterature text book. Taking into account the age and level of understanding of students, dramatic works were not reflected in the program. The textbook is dominated by works written in the epic genre.

***Keywords:*** *epic, comparison, analysis, method, literature*

## Giriş

Epik əsərlərin məzmununu həyatdan götürülmüş hadisələr təşkil edir. Belə əsərlərdə yazıçı tərəfindən yaradılan surət, lövhə, həyatdakı hadisələri, təbiət lövhələrini, insan xarakterlərini oxucunun nəzərinə çatdırmağa, onun vasitəsilə ətraf mühitin, varlığın, tarixi hadisənin dərk olunmasına xidmət edir. Epik əsərlərlə yanaşı mövzuya uyğun ədəbiyyat nəzəriyyəsi materialları da verilib. Bədii əsərlərin məzmunu ilə iş aparmaqla bərabər, təhlil prosesində təmsil, hekayə, bədii portret, obraz, mövzu, ideya, süjet və s. haqqında nəzəri məlumatlar mənimsədilməlidir. Bu materiallardan bəziləri haqqında şagirdlər aşağı siniflərdən müəyyən məlumatlara malikdirlər, bəziləri isə onlar üçün yeni anlayışlardır (Əhmədov, 1991: 455).

Müəllim həmin materialların mənimsədilməsi zamanı bu məsələni diqqətdə saxlamalıdır. Belə ki, müəyyən qədər məlumatlı olduqları material keçirilərkən əvvəl qazandıqları biliklər yada salınmalı, ümumiləşdirilməli, sonra yeni məlumatların mənimsədilməsi başlanılmalıdır. Əlaqəsi ola bilən, xüsusən də yeni məlumatlarla zəngin olan mövzular keçilərkən isə həmin materialların qarşdırılmaması üçün onların müqayisəli şəkildə tədrisi səmərəli nəticə verə bilər. Bu sahədə

fəal/interktiv təlimin çoxsaylı iş (Venn diaqramı, şaxələndirmə və s.) üsullarından istifadə etmək olar.

Müəllim fəal təlim texnologiyalarının geniş imkanlarından istifadə edərək dərsi daha maraqlı, canlıqura və əsərin ideyasının daha yaxşı başa düşülməsi və mənimsənilməsinə nail ola bilər. Lakin fəal təlim texnologiyalarından yenilik xatirinə istifadə etmək düzgün deyil. Bu və ya digər xüsusiyyətə malik ədəbi materialın tədrisi zamanı interaktiv təlim texnologiyasının hansı növündən istifadə etməyin dahasəmərəli və faydalı olacağı müəyyənləşdirilməli, sonra dərsə tətbiq olunmalıdır.

Bütün bu göstəricilər aşağıdakı nəticələrə gəlməyə imkan verir:

1. Müasir dərsin əsas tələblərindən biri şagirdlərin fəallaşdırılmasıdır. Ümumtəhsil məktəblərində şagirdlərin fəallaşdırılmasında fəal təlim texnologiyalarının pedaqoji imkanları genişdir.
2. Şəxsiyyətyönümlü, nəticəyönümlü təhsil ilk növbədə fəal təlim texnologiyalarından istifadə zərurətini meydana çıxarır.
3. Dərsin fəal təlim metodları ilə təşkil olunması şagirdlərdə mənimsəmə qabiliyyətinə, onlarda dəqiqlik, məsuliyyət hissinin formalaşmasına, vaxtdan səmərəli istifadə etmək, idraki inkişaf və informasiyanın qısa vaxtda obyektlərə çatdırılması məsələlərinin həllinə şərait yaradır.
4. Fəal təlim texnologiyaları ənənəvi təlimdə olmayan həm şagird-müəllim- valideyn birliyinin əməli fəaliyyətini, bu üçlüyün böyük potensial imkanlarını müəyyənləşdirir, həm də şagirdlərin təlim-tərbiyə işlərinin bütün parametrləri üzrə səmərəli fəaliyyətinə, eyni zamanda onların yaradıcılıq qabiliyyətlərinin inkişafına geniş şərait yaradır.
5. İnteraktiv metodlara dair məlumat verən mənbələrdən aydın olur ki, onun müxtəlif növlərinin (beyin həmləsi, BİBÖ, klaster, karusel, diskussiya, Blum taksonomiyası, kublaşdırma və s.) hər biri spesifik cəhətlərə malikdir. Bu metodlardan istifadə təlim fənninin ayrı-ayrı mövzularının diqqət mərkəzində saxlanılması materialın məzmununun daha yaxşı mənimsənilməsinə müsbət təsir göstərir.
6. Ədəbi-bədii material üzərində işi interaktiv təlim metodlarının münasib növü ilə təşkil etdikdə bu, şagirdlərin sərbəst düşünməsinə,müstəqil fikir söyləməsinə imkan verir. Bu da təfəkkürün inkişafına səbəb olur
7. Fəal təlim texnologiyalarından istifadə ədəbiyyat dərslərinin tərbiyəedici və inkişafetdirici imkanlarını genişləndirir, dərsin qarşısına qoyulan tələblərə cavab verməyə əlverişli şərait yaradır.

V sinifdən IX sinfə kimi ədəbiyyat dərsliklərində epik əsərlərə geniş yer verilmişdir. Bədii əsərlərin daha yaxşı mənimsənilməsi üçün onların təhlil edilməsi olduqca əhəmiyyətlidir. Əsərin təhlili zamanımüqayisə priyomundan da istifadə olunur. Müqayisə priyomunun həm didaktik, həm də məntiqi əhəmiyyəti vardır. Ona görə ki, müqayisə priyomundan bütün fənlərin tədrisində istifadə edilir və şagirdlərdə düzgün mühakimə yürütmək bacarığını formalaşdırır. Epik əsərlərin təhlilində də bu priyomdan istifadə edilir. Epik əsərlərdə surətlər daha ön planda olur və surətlərin eyni əsaslarla müqayisə edilməsi onların səciyyəvi cəhətlərini, oxşar və fərqli xüsusiyyətlərini ortaya çıxardır. Surətlərin səciyyəvi cəhətlərini ortaya çıxardarkən onların dünyagörüşünün, əsərdəki mövqeyinin müəyyənləşdirilməsi olduqca önəmlidir. Onu da qeyd etmək lazımdır ki, aşağı siniflərdə şagirdlər surətləri birbirilə müqayisə etməyə böyük həvəs göstərirlər.

Müəllim şagirdləri müqayisə priyomundan düzgün şəkildə istifadə etməyə yönləndirməli, surətləri müqayisə etməyə yönəldəcək tapşırıqlar və suallar seçməlidir. Müəllim şagirdlərdə müqayisə bacarığınıyaratmaq üçün elə əsərlər seçməlidir ki, o müqayisə etmək zərurəti yaratsın. Epik əsərlərin müqayisəli təhlili zamanı bir sıra məsələləri də nəzərə almaq lazımdır. Janr xüsusiyyətlərini nəzərə almaq, müqayisəolunacaq əsərləri, obrazları düzgün seçmək olduqca önəmlidir. Bundan əlavə əsərlərin müqayisəli təhlili zamanı yeni təlim metodlarından istifadə etmək şagirdlərdə müqayisəyə həvəs oyadacaqdır. Venn diaqramı, müqayisə cədvəli və başqa təlim metodlarından istifadə olunması müqayisə üçün olduqca əlverişlidir (Bayramov, 2010).

Bədii əsərlərin daha yaxşı mənimsənilməsi üçün onların təhlil edilməsi olduqca əhəmiyyətlidir. Ədəbiyyat fənn kurikulumunda bədii əsərin təhlili üzrə işin 1.2. əsas standartının 1.2.1., 1.2.2., 1.2.3., 1.2.4. alt standartları ilə müəyyənləşdirilməsi və təlim nəticələrinin qeyd olunması, ədəbiyyat fənnindən metodik vəsaitdə müəllimlər üçün təhlil üzrə iş haqqında məlumatların olması, müasir ədəbiyyat dərsliklərində şagirdləri təhlilə sövq edəcək tapşırıqların və “Araşdırın. Fikirləşin. Cavab verin” başlığı altında sualların verilməsi əsərlərin təhlili üçün istiqamətləndirici rol oynayır. Əsərin təhlili zamanı müqayisə priyomundan da istifadə edilir. Burada belə bir sual ortaya çıxır ki, müqayisə priyomu nədir?

Təlim priyomları şagird fəaliyyətinin idarəolunan bir prosesə çevrilməsində böyük rol oynayır. Təlim priyomları şagirdləri daha müstəqil fəaliyyətə sövq edir və şagirdlərin aktivliyini təmin edir. Müqayisəpriyomu da bunlardan biridir. Bu priyomdan istifadə zamanı şagirdlərin müqayisə etdikləri obyektlərhaqqındakı bilikləri daha da konkretləşir. Bu da şagirdlərin təfəkkürünün inkişafına yol açır.

Ona görəki, müqayisə olunan obyektlər arasında ortaya çıxan fərqlər və ya oxşarlıqlar o obyektlərin daha yaxşı yadda saxlanılmasına səbəb olur. Müqayisə priyomunun əsas xüsusiyyətlərindən biri onun məntiqiliyidir. Çünki müqayisə məntiqi cəhətdən mümkün olan obyektlər üzərində aparılır. Prof. N.Kazımov müqayisə priyomu haqqında yazır: "Bizcə müqayisə priyomunu üç növə ayırmaq olar. 1) tam müqayisə, 2) tutuşdurma, 3)qarşılaşdırma. Birinci halda müəllim həm oxşar, həm də fərq əlamətlərini, ikinci halda yalnız oxşar əlamətləri, üçüncü halda isə yalnız fərq əlamətlərini aşkara çıxarmağa çalışır. Tədris işində müqayisə priyomunun hər üç növündən yeri gəldikcə istifadə etməklazımdır" (Aslanov, 2011: 31-34).

Müqayisə priyomundan istifadə həm də şagirdlərin dərsdə fəallığının artmasına səbəb olur. Müəllim çalışmalıdır ki, şagirdlərdə müqayisə bacarıqları formalaşdırsın. Şagirdlərdə bu bacarıqlar birdən-birə formalaşmır, bu tədricən baş verən prosesdir. Bu zaman belə bir sual yaranır ki, şagirdlərdə müqayisə bacarıqlarını necə yaratmaq olar? Burada ən önəmli vəzifə müəllimin üzərinə düşür. Bizlər bilirik ki, insanda bir bacarığın formalaşması o sahədə görülən praktik işdən və müstəqil fəaliyyətdən asılıdır. Bir sözlə, müəllim müqayisə üsulunu sinifdə tətbiq etməklə bu bacarığın formalaşmasına nail ola bilər. Bunun üçün müəllim müqayisə olunacaq mövzuları, surətləri düzgün seçməli, şagirdləri müqayisəyə sövq edəcək sual və tapşırıqlardan, yeni təlim metodlarından (Venn diaqramı, müqayisə cədvəli) istifadə etməlidir. Epik əsərlərin təhlilində də müqayisə priyomundan istifadə olunur.

Epik növdə olan əsərlərdə yazıçı müəyyən hadisə və ya əhvalatı təhkiyə yolu ilə oxucuya çatdırır. Yazıçı epik növün müxtəlif janrlarına (təmsil, hekayə, roman, povest, poema) müraciət etməklə həyat hadisələrini ətraflı şəkildə təsvir edir. Lirik və dramatik növdə olduğu kimi, epik növdə yazılmış əsərlərə də ədəbiyyat dərsliklərində geniş yer verilmişdir. Epik növün V sinifdə əfsanə, nağıl, təmsil, hekayə,VI və VII sinifdə əfsanə, nağıl, təmsil, hekayə, dastan, VIII sinifdə hekayə, dastan, poema, IX sinifdə hekayə, poema, roman, povest janrları tədris olunur.

Camal Əhmədov müqayisənin surətlərin təhlilində mühüm vasitə olduğunu qeyd edir və yazır: "Müqayisəni həm fərqli səciyyəli, həm də zidd səciyyəli surətlər üzrə aparmaq olar. Müsbət, yaxud mənfi səciyyəli surətləri müqayisə etməkdə məqsəd onların ümumi oxşar cəhətlərini və fərqli xüsusiyyətlərini aydınlaşdırmaq, həm də səciyyələrindəki fərqləri müəyyənləşdirməkdən ibarətdir" (Aslanov, 2011: 313).

Şagirdlər obrazları səciyyələndirərkən onların tipik xüsusiyyətləri haqqında məlumatlı olmalıdır ki,onları düzgün şəkildə fərqləndirə bilsinlər. Onu da qeyd etmək lazımdır ki, müqayisə priyomundan ən çox obrazların öyrənilməsi zamanı istifadə olunur. Burada ən önəmli məsələlərdən biri də müqayisə olunacaq obrazların düzgün seçimidir. Soltan Hüseynoğlu bu barədə yazır: "Müqayisə üçün götürülən surətlərin düzgün seçilməməsi xarakterik nöqsanlardan biridir. İstənilən bədii obrazları bir-birilə müqayisə etməyin mümkün olduğunu düşünən müəllimlər də var. Surətlərin düzgün seçilməməsi buəməliyyatın müvəffəqiyyətsiz olmasına, obrazlar haqqında dayaz, hətta bəzən yanlış təsəvvürün yaranmasına gətirib çıxarır" (Əliyeva, 2011: 11).

Epik əsərlərin müəyyən janr xüsusiyyətlərinə əsasən müqayisəli təhlilinə nəzər yetirək. Təmsillərdəinsana aid xüsusiyyətlər heyvan, əşya, təbiət surətlərinin üzərinə köçürülür və yazıçı bu surətlərin timsalında öz nəsihətamiz fikirlərini oxucuya çatdırır. 8-ci sinifdə Hikmət Ziyanın "Kərgədan və qarışqa" təmsilindəki kərgədan və qarışqa obrazlarını müqayisəli təhlil etməklə kərgədanın tənbəl, kobud, qarışqanın isə özünə inamlı, zəhmətsevər xarakteri ortaya çıxır. Şagirdlərdə müqayisə bacarığınıformalaşdırmaq üçün onlara aşağıdakı suallar verilə bilər.

1. Kərgədan və qarışqa obrazının bir-birindən fərqli hansı cəhətləri var?
2. Tənbəllik və əməksevərlik haqqında nə deyə bilərsiniz?
3. Sizin obrazlara münasibətiniz necədir?
4. "Tənbəllik azar artırar, işləmək canı saf eylər " atalar sözü ilə təmsildəki verilən ortaq fikir nədir?

Müqayisəli təhlildə, sadəcə, fərqli xüsusiyyətlərə deyil, oxşar xüsusiyyətlərə də yer verilir. Təmsildə bu xüsusiyyətlərin hər ikisi olduqda Venn diaqramından istifadə edilir. Müqayisəli təhlil zamanı müqayisəyə uyğun obyektlərin seçilməsi başlıca şərtlərdən biridir. Məs: 5-ci sinifdə tədris olunan "Yetim İbrahimin nağılı" əsərində İbrahimi anası ilə müqayisə etmək heç bir əhəmiyyət kəsb etməyəcək, lakin İbrahimi ona qarşı olan qüvvələrlə, yəni tacirlə, padşahla müqayisə etmək daha məqsədəuyğundur.

Müqayisəyə uyğun obyektlər seçildikdən sonra, onları hansı əlamətlərinə görə müqayisə ediləcəyi də önəmlidir. Belə ki, düzgün obyektlər seçildikdən sonra onlar eyni əsaslar üzrə müqayisə olunmalıdır ki, aralarındakı fərq dəqiq şəkildə dərk oluna bilsin. Yetim İbrahim – ağıllı, dürüst,

